# عَقِيدَةُ الشَّافِعِي

رضي الله عنه

# İmam əş-Şafinin əqidəsi

**Müəllif**

**Alləmə əl-Bərzənci əş-Şafi**

**Tərcümə**

***Əşyab Qubavi***

# İçindəkilər

# Tərcüməçinin müqəddiməsi

Hər əsrdə dinini təzələyəcək bir imam izhar etməklə qullarının sağlam əqidə üzərə qalmalarına imkan yaradan Allaha sonsuz həmdü sənalar, Onun rəsuluna, rəsulunun zövcələrinə, ailəsinə, səhabələrinə və qiyamətə qədər onların haqq yolu üzərə gedənlərin üzərinə salam olsun. Sonra isə:

Allahu Təala öz peyğəmbərini göndərmədən öncə bəşəriyyət zil zülmət içinə qərq olmuş, şirk və küfr buludları hər tərəfi sararaq iman günəşi nurunun yayılmasına əngəl olmuşdur. İnsanların bir qismi təhrif olunmuş kitablara, digər bir qismi isə əsli əsası olmayan batil etiqadlarına sarılı idilər. Allahın rəhm etdiyi az bir qrup müstəsna. Belə bir durumda Allah, bəşəriyyəti zülmətlərdən nura çıxarmaq üçün öz rəsulunu, Muhəmməd Mustafanı rəsul və peyğəmbər olaraq göndərdi. Allahın xeyir duası və salamı onun üzərinə olsun. O, necə də görəvləndirildiyi işi haqqı ilə əda etdi. Özündən əvvəlki peyğəmbərlərin dinini təzələdi. Ümməti üçün gecəsi gündüzü kimi aydın olan bir yol tərk edərək rəbbinə qovuşdu. Allahın rəhməti və bərəkəti onun, onun ailəsinin, zövcələrinin üzərinə olsun, amin.

Allah rəsulunun –*salləllahu aleyhi və səlləm* - tərk etdiyi bu minhəc bidətsiz, olduğu kimi ümmətə hakim oldu. Daha sonra islamın bətninə qara yara olan iki zəlalət firqəsi, rafizilər və xaricilər peyda oldular. Həzrəti Osman bin Affanın zamanında çıxan bu zəlalət firqələrinə başda səhabələr olmaqla bir çox alimlər rəddiyyələr verdi. Həzrəti Əli bin Əbi Talib elmi rəddiyyələri ilə yanaşı bu iki tayfaya qarşı hərbi mübarizəyə başladı. Zaman azacıq irəliləmişdi ki, üçüncü batil bir firqə olan mürciə firqəsi ortaya çıxdı. Bu firqə də digər

zəlalət firqələri kimi sərt təpki gördü. Tabiindən olan bir çox alimlər bu tayfalara şiddətlə rəddiyyələr verirdilər. Bir müddət sonra bu üç zəlalət firqəsindən biri olan xariciliyin bətnindən yeni bir zəlalət firqəsi olan mötəzilə çıxdı. İmam Həsən əl-Bəsrinin zamanında toxumu səpilən bu firqə də sərt təpkilərə hədəf oldu. Ümmətin sadiq imamları hər fürsətdə bu firqələrlə münazərələr qurur, onların iddialarını elmi dəlillərlə çürüdür və insanları onlardan çəkindirirdilər.İmam Əbu Hənifə, İmam Malik, İmam Leys, İmam əl-Əvzai, İmam Sufyan əs-Səvri, İmam Sufyan bin Uyeynə, İmam İshaq bin Rahiveyh, İmam Əhməd bin Hənbəl, İmam Davud əz-Zahiri, İmam əl-Muzəni, İmam əl-Buveyti kimi ümmətin qısqanc alimləri öz həyatlarını Allahın dininə xidmətə, xüsusən də bidət firqələrinə rəddiyyə verməyə sərf edib. Bu işdə fədakarlıq göstərən imamlardan biri də imamların sultanı, müctəhidlərin seyyidi, hədis və sünnətin nasiri, fəqih, müfəssir, mühəddis, ədib, Muhəmməd bin İdris əş-Şafi əl-Muttəlibi əl-Quraşi idi. Allah yolunda qınayanın qınamasından qorxmayan bu imam, başda mötəzilə olmaqla bütün batil firqələrə rəddiyyələr vermiş, onların hüccətlərini çürüdərək yox etmiş, bir sözlə ümmətə öz dinini, sağlam əqidəni təzələmişdir.

Ondan sonra gələn tələbələri, Əhməd bin Hənbəl, Əbu Yaqub əl - Buveyti, İmam əl-Müzəni, İmam əl-Hümeydi, İmam əz-Zəfərani, Əbu Səvr, İmam əl-Kərabisi və başqaları bu yolu sürdürmüşlər. Qısacası hər əsrdə bir yeniləyici alim gələrək insanlara dinlərini yeniləmişdir.

Tərcüməsi ilə şərəfləndiyimiz bu kiçik risalə də məhz İmam əş-Şafinin əqidəsindən bəhs edir. Müəllifi Muhəmməd bin Rasul əl-Bərzənci olan bu kiçik risalənin yazılma səbəbi, müəllifin zamanında ortaya çıxan bəzi bidət əhlinin sağlam əqidə sahiblərini zəlalətdə ittiham etməsidir. Əfsuslar olsun ki, bu bidət əhlinin hamısı özünü Əhli Sünnətin imamlarına nisbət edirdilər. Şafi üləmasından olan İmam əl-Bərzənci də bu durumun qarşısında İmam əş-Şafinin müdafiə etdiyi əqidəni ondan gələn rəvayətlərlə toplayıb ümmətə sunmuşdur. İsbat etmişdir ki, İmam əş-Şafiyə uymaq, yəni "şafii" olmaq təkcə həmən imamın fiqhinə tabe olmaqla olmur. Bu məqamda İmam Əhməd İbnu Teymiyyənin bir sözünü zikr etmək yerinə düşər. O mübarək zat buyurur: **"Hər bir imama, onun onlardan uzaq olacağı qövmlər nisbət edilmişdir. Bəzi qövmlər özlərini Malikə**

**nisbət etsə da Malik onlardan uzaqdır. Bəzi qövmlər özlərini əş-Şafiyə nisbət etsələr də əş-Şafi onlardan uzaqdır. Bəzi qövmlər özlərini Əbu Hənifəyə nisbət etsələr də Əbu Hənifə onlardan uzaqdır".**(Məcmuu-l-Fətəva)

Bunun kimi özünü İmam Əhmədə nisbət edən neçə neçə topluluq var ki, İmam Əhməd onlardan uzaqdır. Eləcə də özünü sələfə nisbət edən neçə neçə insanlar var ki, sələf onlardan uzaqdır.

Allah bu işinə görə ondan razı olsun və onu peyğəmbərlər, siddiqlər, şəhidlər və salehlərlə birgə həşr etsin, amin.

## Kitabda gördüyüm işlər

1. Kitabı ərəbcədən azərbaycancaya tərcümə etdim. Tərcümə etdiyim basqı, Doktor Muhəmməd bin Abdirrahman əl-Xumeyyisin təhqiq etdiyi, Riyad şəhərində "Məktəbətu-l-Məarifi li-n-Nəşri və-t-Təvzi" yayınevinin hicri 1426-cı ildə nəşr etdiyi ikinci nəşrdir.

2. Bəzi məqamların anlaşılması üçün cüzi haşiyələr və mötərizə arası açıqlamalar yazdım.

3. Kitabı, İmamın sözlərinin sıralamasını dəyişmədən bu sıralamaya uyğun əqidəvi başlıqlara ayırdım. Buda hər mövzu haqda İmamın sözündən xəbərdar olmağa yardım edir.

4. Bacardığım qədər kitabda adı keçən İmamlar haqda məlumat verdim.

5. Müəllif haqqında qısa məlumat verdim.

Bu işimizn qəbulunu uca Allahdan yalvararaq istəyir, ondan bu əməlimizi oğul uşağın fayda verməyəcəyi gündə faydalı etməsini yalvararaq istəyirik. O hər şeyə qadir, qulları üzərində mütləq hökm sahibidir.

***Əşyab Qubavi***

Hicri 21.10.1432-ci il

## Allamə Muhəmməd bin Rasul əl-Bərzənci əl-Hüseyni əş-Şafi

O, Muhəmməd bin Rasul bin Abdisseyyid bin Abdirrasul bin Abdisseyyid əl-Hüseyni əl-Bərzənci əş-Şafidir. Hicri 1040–cı ildə İraqda yerləşən kürd şəhərində, Şəhrazurda dünyaya gəlmişdir. Kiçik yaşlarında atasının yanında Qurani Kərimi əzbərlədikdən sonra elm tələbi üçün səfərlər etmişdir. Elm dalıyca, Mədinə, Bağdad, Dəməşq, Yəmən, Mardin, Hələb, Misir və başqa yerlərə səfər etmiş, o yerlərin tanınmış alim üləmasından dərs almış və Mədinədəki "Məscidu-n-Nəbəvi" də dərs vermişdir. Mədinədə ikən İbrahim bin Həsən əl-Kərvani və Əhməd əl-Qəşşaşidən dərs almışdır. Zamanında şafilərin müftisi kimi tanınmışdır. Şeyxləri arasında Əhməd əs-Səllahi, Əbu-l-Vəfa əl-Aridi, Abdulbaqi əl-Hənbəli, İshaq əz-Zubeydi və başqa zatlar da mövcuddur. Yazdığı əsərlərin bolluğu ilə məşhurdur. Əsərləri arasında bu tərcümə etdiyimiz "Aqidətu-l-İməmi-ş-Şafi", "əl-Qəvlu-s-Sədid", "ən-Nəvafid li-r-Ravafid" və başqa əsərlər mövcuddur. İmam hicri 1103-cü ildə Məhərrəm ayında Mədinə şəhərində vəfat etmiş və oradakı "əl-Bəqi" qəbirsanlığında dəfn olunmuşdur. Allah rəhmət etsin, amin.

## Müəllifin müqəddiməsi

بسم الله الرحمن الرحيم

Həmd aləmlərin Rəbbinədir. Salət və salam da bütün peyğəmbərlərə və rəsullara, xüsusən peyğəmbərlərin sonuncusu, *(qiyamətdə)* əli üzü parlaq olacaq kəslərin başçısı, din günündə günahkarların şəfaətçisi olan seyyidimiz Muhəmmədə, onun ailəsinə və bütün səhabələrinədir. Sonra isə:

Bu, müsəlmanların imamı, müctəhidlərin seyyidi, quraşi və adı ilə adlandırıldığı seyyidimiz, ərəb Muhəmməd peyğəmbərin – *salləllahu aleyhi və səlləm* - əmisi oğlu Müttəlibi imamın, nasiru-l-hədis, Əbu Abdillah Muhəmməd bin İdris əş-Şafinin[1] etiqadından bir nübzədir[2]. Allah ona rəhmət etsin və bizə də onun xatirinə rəhmət etsin, amin. Əshabından güvənilən, hafiz və etibarlı kəslərin rəvayəti ilə onun kitablarından Qurana və sünnətə mütabiq,[3] bürhan oxu və nizələriylə həva əhlinin sinəsini deşici, möminlərin sinələrinə vəsvəsə verən vəsvəsəçi insan və cin şeytanların vəsvəsəsindən qoruyucu *(bir əsər)*

[1]O, İmamımız, alimlərin sultanı Muhəmməd bin İdris əş-Şafidir. Əslən Qureyşlidir. Soyu Allah rəsulunun –sallələllahu aleyhi və səlləm-soyu ilə birdir. Fiqhdə imam, mütləq müctəhid, eləcə də hədis, təfsir, ədəbiyyat, və ərəb dilində imamlıq zirvəsinə çatmışdır. Şafi məzhəbinin banisidir. Hicri 150-ci ildə Fələstinin Qəzza şəhərində anadan olmuş, hicri 204-cü ildə Misirdə vəfat etmişdir. Şeyxləri arasında İmam Malik, Muhəmməd bin Həsən əş-Şeybani, Sufyan bin Uyeynə, Muslim bin Xalid əz-Zənci, Vaki bin əl-Cərrah və başqaları, tələbələri arasında Əbu Yaqub əl-Buveyti, Rabi bin Süleyman əl-Muradi, İmam Əhməd, əl-Muzəni və başqaları var. Kitabları arasında isə fiqh və hədis üsulunda yazılmış ilk kitab olan "ər-Risalə" fiqhdən "əl-Umm" fiqhu-l-muqarandan "İxtilafu-l-İraqiyyin" və başqa əsərləri vardır. Allah rəhmət etsin, amin.

[2]Müxtəsər bir yazı

[3]Uyğun

olaraq topladım. O,[4] bidət şeytanlarının ordularına qarşı ən böyük hazırlıq, ən möhkəm zireh və səddir.

[4] Bu kitab

## Müqəddimatlar

## Elm tələbinin fəziləti

**Birinci:** əş-Şafi – radiyallahu anhu - dedi: “Qul Allaha, Allahın onun üzərinə fərz etdiyi şeylərin ədasından sonra elm tələbindən daha fəzilətli bir şeylə yaxınlaşmaz”. Bu sözü ondan Hərmələ bin Yəhya[5] rəvayət etmişdir.

Yenə belə demişdir: “Elm tələbi nafilə namazından daha fəzilətlidir”. Bu sözü isə ondan Rabi bin Süleyman[6] rəvayət etmişdir.

Yenə demişdir: “Dünyanı istəyən elmə yönəlsin, axirəti istəyən də elmə yönəlsin”.

Həmçinin demişdir: “Elmə bütününü verməsən(elm özündən)sənə bəzisini verməz”

“ər-Risalə” kitabında demişdir: “ (Elmlə)çox məşğul olmaqda son güclərini sərf etmək, onun tələbinə əngəl olan hər şeydə səbr etmək, onun tələbində niyyəti Allaha ixlaslı qılmaq(çünki)həqiqətən əməllər niyyətə görədir, və yardımda Allaha yönəlmək elm tələbələri

---

[5]O, Hərmələ bin Yəhya bin Abdillah bin Hərmələ bin İmrandır. İmam, fəqih və mühəddis birisidir. İmam əş-Şafinin tələbələrindən və əshabındandır. İmam Şafi, İbnu Vəhb, Eyyub bin Süveyd, Bişr bin Bəkr, Səid bin Əbi Məryam və başqalarından rəvayət etmişdir. İmam Müslim, İbnu Macə və başqaları da ondan hədis dinləmişdir. Hədisdə “saduq” dur. Hicri 166-ci ildə doğulmuş, hicri 244-cü ildə vəfat etmişdir. Allah rəhmət etsin, amin.

[6]O, ər-Rabi bin Süleyman bin AbdilCabbar əl-Muradi əl-Misridir. İmam əş-Şafinin ən yaxın tələbələrindən, onun müəzzini və son məzhəbini, bu barədə yazdığı kitablarını rəvayət edən zatdır. İctihad dərəcəsinə çatmış, elmi və zəkası ilə tanınmışdır. İmam əş-Şafi, Əbu Yaqub əl-Buveyti, Yəhya bin Həssan ət-Tinnisi, Abdurrahmən bin əş-Şeybə və başqalarından rəvayət etmişdir. Eləcə də Əbu Davud, Nəsai, İbnu Macə və başqa bir çox alimlər ondan rəvayət etmişdir. Hicri 174-cü ildə doğulmuş, hicri 270 ci ildə vəfat etmişdir.

üzərində bir haqdır. Həqiqətən Onun yardımı olmadan heç bir xeyir əldə edilməz”.

## Kәlam elminin zәrәri

**İkinci:** Zәkәriyya әs-Saci[7] dedi: "әş-Şafi - rahimahullahu - tәala daima fiqhә nәzәr salmağı әmr edәr, cidal vә kәlamdan isә nәhy edәrdi".

Yunus bin Abdi-l-Əla[8] dedi: "әş-Şafini belә deyәrkәn eşitdim: "Allahın bir qulu, Allahın şirkdәn başqa nәhy etdiyi bütün şeylәrlә imtahan etmәsi, onun üçün "kәlam"a nәzәr salmasından xeyirlidir. Mәn kәlam әhlindәn heç bir zaman (edәcәklәrini) zәnn etmәdiyim şeylәri gördüm".

Yenә (Yunus bin Abdi-l-Əla) demişdir: әş-Şafi dedi: "Kәlam әhlinin elә şeylәr etdiyini gördüm ki, Alahın nәhy etdiyi hәr şeyi edәn birisini görmәyim mәnә onları görmәkdәn xoş gәldi". (Yunus bin Abdi-l-Əla) dedi: Ona belә dedim: "Bilirsәnmi iki sahibimiz – Maliki vә Leysi qәsd edir - nә deyәrdilәr? Deyәrdilәr ki әgәr "kәlam" sahibi birisini su üzәrindә yeriyәn görsәn şәrrindәn әmin olma" Belә dedi: "Az deyiblәr. Hәtta onu sәmayla yer arasında havada gәzәn görsәn şәrrindәn әmin olma".

---

[7]O, Əbu Yәhya,Zәkәriyya bin Yәhya Bin Abdirrahman әs-Sacidir. Talut bin Abbad, Əbu Rabi әz-Zәhrani, Ubeydullah bin Muaz әl-Ənbәri, Muhәmmәd bin Bәşşar, atası Yәhya әs-Saci vә başqalarından rәvayәt etmişdir. Rabi bin Süleymandan vә әl-Muzәnidәn elm almışdır. Şafi füqәhasından vә hәdis әhlindәndir. "İxtilafu-l-Ülәma" vә "İlәlu-l-Hәdis" kimi әsәrlәrin sahibidir. Hicri 370-ci ildә Bәsrәdә vәfat etmişdir. Allah rәhmәt etsin, amin.

[8]O, Yunus bin Abdi-lәla bin Mәsira bin Hafs bin Hәyyandır. Hafiz şeyxulislamdır. İmam әş-Şafi, Sufyan bin Uyeynә, Abdullah bin Vәhb vә başqa zatlardan rәvayәt etmişdir. İmam Muslim, Nәsai,İbnu Macә İbnu Hibban vә başqa hәdis nәhәnglәri dә ondan rәvayәt etmişlәr. Yәhya bin Hassan onu "İslam rüknlәrindәn bir rükn" adlandırmışdır. İmam Şafi Böyük Mәscidin qapısını göstәrәrәk demişdir: "Bu qapıdan Yunus bin Abdi-l-Əladan daha ağıllı birisi girmәyib. Hәdisdә siqa birisidir. Hicri 170-ci ildә doğulmuş, hicri 264-cü ildә vәfat etmişdir. Allah rәhmәt etsin, amin.

İbnu Əbi-l-Həkəm[9] dedi: əş-Şafini belə deyərkən eşitdim: “İnsanlar “kəlam”da nə olduğunu bilsələrdi, ondan, şirdən qaçdıqları kimi qaçardılar”.

Həmçinin demişdir: “”Kəlam” haqqında elm cəhalətdir”.

Yenə demişdir: “Alimlərə bir şey vəsiyyət edilərsə, mütəkəllim[10] birisinə (ondan heç nə) verilməz”.

Yenə demişdir: “Haqqında “kəlam” yazılan və (bu halla) qurtulan kimsə yoxdur”.

Rabi bin Süleyman demişdir: əş-Şafi dedi: “Qulun, Allaha şirkdən savayı bütün günahlarla (axirətdə) Allahla qarşılaşması, həvalardan (kəlam elminin həvalarından) bir şeylə Allahla qarşılaşmasından xeyirlidir”.

Yenə Rabi bin Süleyman dedi: əş-Şafini pilləkənlə enərkən gördüm. Bu an bir topluluq məsciddə “kəlam”la bağlı söhbət edirdi. Qışqıraraq belə dedi: “Ya yanımızda xeyirlə qalın, ya da bizi tərk edin”.

Əbu Səvr[11] və əl-Kərabisi[12] dedilər: əş-Şafini belə deyərkən eşitdik: “Kəlam əhli haqdakı hökmüm budur ki çubuqla vurulsunlar, (bu hal

[9]O İbnu Əbi-l-Həkəm yox, İbnu Abdi-l-Həkəmdir. Elə düşünürəm ki, nəşr xatası olaraq İbnu Əbi-l-Həkəm yazılıb. Çünki İmam əş-Şafidən eşidən kəslər haqqında acizanə apardığım bir araşdırma nəticəsi olaraq önümə İbnu Əbi-l-Həkəm deyil, Abdullah bin Abdi-l-Həkəm çıxdı. Həm də İmam əş-Şafinin bu sözünü İmam əz-Zəhəbi “Siyəru əlami-n-Nübələ” kitabında İbnu Abdi-l-Həkəmin rəvayətilə zikr etmişdir. İbnu Abdi-l-Həkəm, Misirdə Malikilərin müftisidir, elm və fəzilət sahibi birisidir. İmam Malik, Leys bin Səd, Muslim bin Xalid əz-Zənci, Yaqub bin Abdirrahman əs-Səkəndəri, İbnu Vəhb və başqalarından rəvayət etmişdir. Eləcə də Əbu Muhəmməd əd-Dərimi, Muhəmməd bin əl-Buraqi, Əbu Yəzid əl-Qaratisi və başqaları ondan rəvayət etmişlər. Atası İmam əş-Şafinin məclislərində sıx sıx olardı. Hicri 155-ci ildə anadan olmuş, hicri 214-cü ildə vəfat etmişdir. İmam əş-Şafinin yanında dəfn edilmişdir. Allah rəhmət etsin, amin.

[10]Kəlam, məntiq və fəlsəfə ilə məşğul olan.

[11]O, İbrahim bin Xalid əl-Kəlbi əl-Bağdadidir. İraqlı alim, İmam əş-Şafinin İraqlı tələbələrindən və ilk məzhəbini yayanlardandır. Müctəhid, hüccət bir imamdır. Hicri 170-ci ildə anadan olmuşdur. Sufyan bin Uyeynə, Ubeydə bin Humeyd, Əbu Muaviyə əd-Darir, Vəki bin əl-Cərrah, İmam əş-Şafi və başqalarından rəvayət etmiş, eləcə də Əbu Davud İbnu Macə və başqa bir çox hədis nəhəngləri ondan rəvayət etmişlər. Hədisdə siqadır. Əhməd İbnu Hənbəl onun haqda demişdir: “Əlli ildir ki onu sağlam əqidə üzərə tanıyıram”. Həmçinin İmam Əhməddən bir məsələ soruşulmuş və demişdir: “Bizdən başqasından soruş, fəqihlərdən soruş,

ilə) dəvə üzərində tayfalar və qəbilələr arasında dolaşdırılaraq belə deyilsin: “Quranı və sünnəti tərk edib “kəlam”a yönələnin cəzası budur”.

Əbu Səvrdən soruş. İlk başda rəy əhlindən olsa da İmam əş-Şafiylə görüşdükdən sonra hədisə dönür. Hicri 240 cı ildə vəfat etmişdir. Allah rəhmət etsin, amin.

[12]O, Hüseyn bin Əli bin Yezid əl-Kərabisidir. Künyəsi Əbu Əlidir. Bağdadın fəqihlərindəndir. Məan bin İsa, yezid bin Harun və başqalarından rəvayət etmişdir. İlk başlarda rəy əhlindən olsa da İmam əş-Şafiylə görüşdüyündə hədisə dönür. İmam əş-Şafinin Bağdadlı tələbələrindən və ilk məzhəbini yayanlardandır. Hicri 248-ci ildə Bağdadda vəfat etmişdir. Allah rəhmət etsin, amin.

## Allahın sifətləri haqda gələn naslara gəldiyi kimi iman etmək

**Üçüncü:** Yunis bin Abdi-l-Əla dedi: əş-Şafini belə deyərkən eşitdim: “Allahın, –sübhənəhu və təala - kitabının gətirdiyi, peyğəmbərinin - salləllahu aleyhi və səlləm - ümmətinə xəbər verdiyi adları və sifətləri var. Allahın yaratdıqlarından üzərinə höccət qalxan heç kəsə onlara imandan başqası mümkün deyil. Çünki Quran onları gətirib. Ədalətli birisinin rəvayəti ilə də peyğəmbərin – salləllahu aleyhi və səlləm - sözü ilə səhih şəkildə sabit olmuşdur. Üzərinə höccət sabit olduqdan sonra bunlara müxaləfət edərsə o Allaha qarşı kafir olar. Xəbər yönündən hüccət sabit olmadan öncə isə cəhalətlə üzürlüdür. Çünki bunu bilmək ağılla, görmək və fikirləşməklə mümkün deyil”.

Yenə demişdir: “Allah Təalanın özünü və rəsulullahın – salləllahu aleyhi və səlləm - Onu vəsf etdiyi bu mənalar, həqiqəti fikirləşmək və baxmaq ilə dərk edilməyən şeylərdəndir. Cəhalət səbəbiylə (höccət olacaq) xəbərin çatmasından (sonrakı haldan) başqa kimsə küfrə girməz. Bu barədə varid olan, fəhmdə (sanki) peyğəmbəri – salləllahu aleyhi və səlləm – görərək ondan eşitmiş kimi (mənasını) müşahidə məqamında (göstərəcək) olan bir xəbər olsa da”.

İmam əş-Şafi “ər-Risalə” kitabında dedi: “Vəsf edənlərin, əzəmətinin həqiqətinə[13] çata bilməyəcəyi Allaha həmd olsun. O (Allah) ki özünü vəsf etdiyi kimi və yaratdıqlarının vəsfindən daha yüksəkdir. Vəchinin kərəminə cəlalının izzətinə layiq bir həmdlə Ona həmd edir, Ondan başqasıyla gücü və qüvvəti olmayan birinin yardım dilədiyi kimi Ondan yardım diləyir, onu nemət olaraq verdiyi kəsin azmayacağı hidayətlə ondan hidayət istəyirəm. Şahidlik edirəm ki, Allahdan başqa (haqq) ilah yoxdur, təkdir, Onun heç bir şəriki yoxdur və Muhəmməd Onun qulu və rəsulu, xeyirlisi, vəhyi üçün üstün qılınmış, risaləti üçün seçilmiş, rəhmətini açması və nübuvvəti xətm

[13]Əzəmətini dərk etməyə.

etməsi ilə bütün yaratdıqları üzərinə fəzilətli qılınmış birisidir. Zikr edənlərin Onu zikr etdiyi, qafillərin Onun zikrindən qafil qalacağı sürəcə Allah onun üzərinə xeyir dua endirsin. Allah Muhəmmədə və Muhəmmədin ailəsinə, İbrahimə və İbrahimin ailəsinə xeyir dua endirdiyi kimi xeyir dua endirsin. O Həmiddir[14], Məciddir[15]".

[14]Həmid, Allahın adlarından bir addır. Özünün özünə və yaratdıqlarının ona həmd etdiyi mənaya gəlir.
[15]Məcid də Allahın adlarından bir addır. Şanı uca mənasını verir.

## Üz, eşitmə, görmə, iki göz, Allahın kəlamı və Quranın Allahın kəlamı olması haqqında

Yunus bin Abdi-l-Əla, İbnu Hişam əl-Bələdi, Əbu Səvr, Əbu Şueyb,[16] Hərmələ, Rabi bin Süleyman, əl-Müzəni[17] və başqalarının - hamısını bir siyaqda zikr edərək bəzilərinin rəvayəti bəzilərinkinə qarışıqdır - rəvayət etdiyi kimi əş-Şafi demişdir: "Mənim üzərində olduğum, onları görüb onlardan (elm) aldığım əhli hədisdən olan Süfyan bin Üyeynə,[18] Malik[19] və başqaları kimi əshabımızın da üzərində olduğu

[16]O, Abdullah bin əl-Həsən bin Əhməd əl-Hərranidir. Mühəddis, imamdır. Hicri 206-cı ildə dünyaya gəlmişdir. Affan bin Müslim və başqalarından rəvayət etmiş, eləcə də Əbu Əli bin əs-Səvvaf, Əbu-l-Qasim ət-Təbərani, Əbu Bəkr əl-Əcuri və başqa bir çoxu ondan rəvayət etmişlər. İmam əd-Daraqutni "siqadır" demişdir. Hicri 295-ci ildə vəfat etmişdir. Allah rəhmət etsin, amin.

[17] O, İsmail bin Yəhya bin İsmail bin Amr bin Muslim əl-Muzəni əl-Misri əş-Şafidir. İmam, müctəhid, elmdə dərya birisidir. Hədisdə rəvayəti az olsa da siqa birisidir.Hicri 175 –ci ildə, İmam Leys bin Sədin vəfatı ilində anadan olmuşdur. İmam əş-Şafidən, Nəim bin həmmad və başqalarından rəvayət etmişdir. Əbu Bəkr İbnu Xuzeymə, Əbu-l-Həsən bin əl Cəusa, Əbu Cəfər ət-Tahavi, Abdurrahmən bin Əbi Hatim və başqaları ondan rəvayət etmişlər. İmam əş-Şafi "əl-Muzəni məzhəbimin nasiridir" demişdir. Hicri 264-cü ildə vəfat etmişdir. Allah rəhmət etsin, amin.

[18]O, Sufyan bin Uyeynə bin Əbi İmrandır. Əbu Muhəmməddir künyəsi. Şeyxulislam, əsrin hafizi, fiqh, hədis və başqa elmlərdə imamdır. İmam əş-Şafinin şeyxlərindən biridir. Kufədə doğulmuş, lakin Məkkədə yaşamış və orada dərs vermişdir. Hicri 107 ci ildə Kufədə anadan olmuşdur. Uşaq ikən hədis tələbinə başlamış, zamanının hədis imamlarından hədis dinləmişdir. Amr bin Dinar, Ziyad bin Aləqa, əl-Əsvəd bin Qeys, Ubeydilllah bin Əbi Yezid, İbnu Şihab əz-Zuhri, Asim bin Əbi-n-Nəcud, Əbu İshaq əs-Səbii, Abdullah bin Dinar, Zeyd bin Əsləm, Süleyman əl-Əməş, İbnu Əbi Leyla və başqalarından hədis dinləmiş və rəvayət etmişdir. Həmçinin, İmam əş-Şafi, əl-Əməş, İbnu Cureyc, Hummən bin Yəhya, Həmmad bin Zeyd, Abdullah bin Mübarək, Abdurrahmən bin Mehdi, Abdurrazzəq, Humeydi, Əhməd ibnu Hənbəl, İshaq bin Rahiveyh, İbnu Əbi Şeybə və başqaları da ondan hədis dinləmiş və rəvayət etmişdir.
İmam əş-Şafi demişdir: "Malik və Süfyan bin Uyeynə olmasaydı Hicazın elmi yox olardı". Hicri 198-ci ildə Məkkədə vəfat etmişdir. Allah rəhmət etsin, amin.

[19]O, Malik bin Ənəs bin Malik bin Əbi Amir bin Amr bin əl-Həris əl-Əsbahi əl-Mədənidir. Şeyxulislam, imam, hüccət, Maliki məzhəbinin qurucusu, Səhih

doğru etiqad haqqındakı sözümüz Allahdan başqa (haqq) ilahın olmadığına Muhəmmədin də Allahın rəsulu olduğuna şəhadəti iqrar etməkdir.

(Həmçinin) Allaha, mələklərinə, kitablarına, Onun rəsullarından heç kəsi (digərlərindən) ayırmayaraq rəsullarına, namazımın, ibadətlərimin, həyatımın və ölümümün aləmlərin rəbbi olan Allah üçün olmasına iman gətirməkdir. Onun heç bir şəriki yoxdur, mən də bunlarla[20]əmr olunmuşam.

Bütün peyğəmbərlərin – Allahın salavatı hamısının üzərinə olsun - gətirdiyi hər şeyə iman edirəm. Bundan (biri də odur) ki, Allahın kitabının gətirdiyi və peyğəmbərinin –salləllahu aleyhi və səlləm - xəbər verdiyi sifətləri var. (Həmçinin iman etdiklərimdən biri də odur) ki, Onun

كُلُّ شَيْءٍ هَالِكٌ إِلَّا وَجْهَهُ

“**Onun Üzündən başqa hər şey həlak olacaq**”
(əl-Qasas, 88)

sözünün və

وَيَبْقَىٰ وَجْهُ رَبِّكَ ذُو الْجَلَالِ وَالْإِكْرَامِ

“**Ancaq Rəbbinin əzəmətli və kəramətli Üzü qalacaq.**”
(ər-Rahmən, 27)

---

rəvayətə görə hicri 73-cü bəzi rəvayətlərə görə hicri 93-cü ildə dünyaya gəlmişdir. Nafi, Səid əl-Məqri, Amir bin Abdillah bin Zubeyr, İbnu-l-Münkədir, əz-Zuhri, Abdullah bin Dinar, Rabiatu-r-Ray və başqalarından elm almışdır. Eləcədə İmam əş-Şafi, Abdurrahmən İbnu-l-Qasim, Əşhab bin Abdiləziz, Əsəd bin əl-Fərrat və başqaları var. Olduqca heybətli birisi idi. Mədinədə olduğu dönəmdə kimsə fətva verməzdi. Allah rəsulu –salləllahu aleyhi və səlləm-orada basdırıldığı üçün miniyə minməzdi. Kitabları arasında “əl-Muvatta” adlı hədis kitabı mühəddislərin dayandığı əsas qaynaqlardandır. İmam əş-Şafii demişdir: “Alimlər zikr olunduğunda Malik bir ulduzdur”. Yenə demişdir: “Səma altında Allahın kitabından sonra əl-Muvatta” qədər səhih bir kitab görmədim. Hicri 179-cu ildə Mədinədə vəfat etmişdir. Allah rəhmət etsin, amin.

[20]Bu saydıqlarıma iman etməklə.

sözünün gərəyi Üzü,

وَهُوَ السَّمِيعُ الْبَصِيرُ

**“O, Eşidən və Görəndir.”**
(əş-Şura, 11)

sözünə görə eşitməsi və görməsi,

تَجْرِي بِأَعْيُنِنَا

**“Gözlərimiz önündə üzüb gedirdi.”**
(əl-Qamər, 14)

sözünə görə iki Gözü var. (Həmçinin iman etdiyim şeylərdən biri də budur) ki, peyğəmbərin –salləllahu aleyhi və səlləm - dəccalı xatırlatdıqda **“O bir gözü kordur, Rəbbiniz isə bir gözü kor deyil”** sözünə görə O, bir gözü kor deyil. (Yenə iman etdiklərimdən bir də budur) ki,

وَكَلَّمَ اللَّهُ مُوسَىٰ تَكْلِيمًا

**“Allah Musa ilə sözlə danışdı”**
(ən-Nisə, 164)

sözünə və

حَتَّىٰ يَسْمَعَ كَلَامَ اللَّهِ

**“... ki, Allahın kəlamını eşitsin.”**
(ət-Tövbə, 6)

sözünə görə Onun kəlamı var. (Yenə iman etdiyim şeylərdən bir də budur) ki, Quran Allahın endirmiş olduğu kəlamıdır, məxluq deyil. Ləfz və səs haqqında danışmaq da bidətdir.

## Allahın zatıyla sifətlərini ayırmama, Onun gülüşü, Əli, Ayağı, yüksəlişi, enişi və başqa sifətləri

(İmam əş-Şafi) dedi: "Həqiqətən Allah məxluqatı "ol" kəliməsi ilə yaratdı. Əgər "ol" məxluqdursa o zaman məxluq məxluq ilə yaradılmışdır".

Yenə dedi: " Ya "Allah var idi həmçinin kəlamı da", ya da "Allah var idi lakin kəlamı yox" demək mümkündür[21]. Kim iqrar edərsə ki Allah felindən öncə olduğu yerdə idi və kəlamı da var idi o zaman "Allahın kəlamı Allahdan başqası və ya qeyrisidir" kimi bir sözü hardan deyir?! (İman etdiyimiz şeylərdən biri də odur ki) O peyğəmbərin – salləllahu aleyhi və sələm - "Allah yolunda öldürülən birisi (Allahın) ona gülərək təbəssüm etdiyi halda Allahla qarşılaşar" sözünə görə Allah mömin quluna (təbəssüm) edərək gülər[22]. (Yenə iman edirik) ki,

بَلْ يَدَاهُ مَبْسُوطَتَانِ

**"Əksinə iki Əli də açıqdır"**
(əl-Maidə, 64)

sözünə görə Onun iki Əli vardır. (Yenə iman edirik) ki,

---

[21]İmam əş-Şafi "mümkündür" dedikdə caiz olmasını qeyd etmir. Yəni "Allah var idi lakin kəlamı yox" demək batildir. İmam əş-Şafinin "mümkündür" sözündən qəsdi bu iki variantdan başqasının olmadığına işarə etməkdir. Doğrusunu Allah bilir.

[22]Allahın bu sifəti də başqa sifətləri kimi Onun uca şanına layiqdir. Yaratdıqlarının gülməsinə əsla bənzəməz. Biz bu sifətlərə Allahın və rəsulunun murad etdiyi şəkildə iman edirik.

وَالسَّمَاوَاتُ مَطْوِيَّاتٌ بِيَمِينِهِ

**“Səmalar onun sağ Əlində bükülüdür”**
(əz-Zumər, 67)

sözünə görə Sağ Əli vardır. (Eləcə də iman edirik) ki, peyğəmbərin – salləllahu aleyhi və səlləm - **“Hər bir qəlb Rəhmanın barmaqlarından iki barmaq arasındadır”** sözünə görə Onun (yaratdıqlarının barmaqlarına bənzəməyən) barmaqları, **“Rəbb Təala ayağını onun üzərinə qoyuncaya qədər”** -yəni cəhənnəmin - sözünə görə (heç bir şeyə bənzəməyən) ayağı var. (Həmçinin iman edirik) ki,

ثُمَّ اسْتَوَىٰ عَلَى الْعَرْشِ

**“Sonra Ərşə istiva etdi”**
(əs-Səcdə, 4)

sözünə və

الرَّحْمَٰنُ عَلَى الْعَرْشِ اسْتَوَىٰ

**“ər-Rəhman Ərşə istiva etdi”**
(Taha, 5)

sözünə görə O, ərşin üzərindədir. (yenə iman edirik) ki, rəsulullahın – salləllahu aleyhi və səlləm - bu barədə xəbər verdiyi üçün O, hər gecə istədiyi kimi dünya səmasına enir. Hədisdə gəldiyi kimi (qiyamət günü Allahı) görməyə də iman edirəm...

## Allahın məşiəti və Onu təşbihdən tənzih etməyin fərz olması haqqında

(İmam əş-Şafi yuxarıdakı sözünün davamında deyir)...Biz bu sifətləri isbat edirik. Zikri uca olan Allahın özündən rədd etdiyi kimi biz də Ondan təşbihi[23] rədd edirik. O demişdir:

لَيْسَ كَمِثْلِهِ شَيْءٌ ۖ وَهُوَ السَّمِيعُ الْبَصِيرُ

**“Ona bənzər heç nə yoxdur, O eşidən və görəndir.”**
(əş-Şura, 11)

(İman edirik) ki,

كَلَّا إِنَّهُمْ عَنْ رَبِّهِمْ يَوْمَئِذٍ لَمَحْجُوبُونَ

**“Xeyir, onlar (kafirlər) o gün Rəblərindən (Onu görə bilməmələri üçün) əngəllənəcəklər”**
(əl-Mutaffifin, 15)

sözünə görə Allah axirətdə görüləcək, möminlər ona göz görə görə açıq aydın şəkildə baxacaq, Onun kəlamını eşidəcəklər. Ayətin (bu dediyimizə) dəlaləti ondadır ki onlar, (möminlər) riza halında əngəllənməyəcəklər. (Yenə iman edirik) ki, Allah Təalanın övliya qulları Onu olduğu sifətdə görəcəklər və Onu görməkdə heç bir şübhə yəni şəkk etməyəcəklər.

(İman edirik) ki, Allah Təalanın iradəsi var və Onun – azzə və cəllə - istədiyindən, qəza və qədərdə təqdir etdiyindən başqası olmur. (Həmçinin) Allah Təalanın

[23] Məxluqa bənzətməni

وَمَا تَشَاءُونَ إِلَّا أَنْ يَشَاءَ اللَّهُ

**“Allah istəmədikcə istəyə bilməzsiniz”**
(əl-İnsan, 30)

sözünə görə (üstün) məşiət[24] qullarının deyil Onundur. (Bu ayətlə) yaratdıqlarına bildirmişdir ki, məşiət Onundur. (bunu etiqad edərək) şer şəklində belə deyirəm:

**وما شئت كان وإن لم أشأ.....وما شئت إن لم تشأ لم يكن**
**خلقت العباد على ما علمت.....ففي العلم يجري الفتى والمسن**

**İstədiyin olur, mən istəməsəm də**
**İstədiyim Sən istəməsən olmaz**
**Qulları bildiyin şey üzərə[25] yaratmısan**
**Gənc və qoca (Sənə aid olan) elm dairəsində hərəkət edir**

[24] Diləmə, istəmə
[25]Əvvəlcədən təqdir etdiyi qədər üzərə.

## Qəza və qədərə iman

(İmam əş-Şafi) dedi: “Qədərə, onun xeyrinə və şərrinə iman edirəm. (Allahın) qəza və qədərindən razıyam. (İman edirəm ki) Qədərin xeyri və şərri Allah Təaladandır. Allahın iradəsinə (iradəsinin təqdir etdiyi) xeyrinə və şərrinə hamısına iman edirəm. O ikisi (xeyir və şərr) Allahın yaratdığı, qullar üzərində təqdir olunan şeylərdir. Allahın, küfr etməsini istədiyi kəs küfr, iman etməsini istədiyi kəs iman edər”.

## Allahın hər şeyi bilməsi, qiyamət saatı, dirilmə, cənnət və cəhənnəm, qəbir əzabı və sorusu, mizan, hesab, kövsər hovuzu, şəfaət və sirat körpüsü haqqında

(İmam əş-Şafi) dedi: "Mötəzilə əgər Allahın (qullar əməl etmədən öncə edəcəkləri haqda) elmini təsdiq etsələr (bu təsdiqləri gərəyi bütün əqidələrinin batil olacağı üçün, münazərə zamanı) yenilərlər. Allah şərdən razı qalmamış, ona əmr etməmiş və onu sevməmişdir. Əksinə itaətə əmr etmiş, onu sevmiş və ondan razı qalmışdır. (İman edirəm) ki, qiyamət saatı gələcəkdir, onun gəlməsində heç bir şübhə yoxdur. (Yenə iman edirəm) ki, Allah qəbrlərdə olanları dirildəcəkdir. (Həmçinin iman edirəm) ki, cənnət və od haqdır, ikisi də yaradılmışdır, (eləcə də) qəbir əzabı, Münkər və Nəkirin[26] sorması, mizan, hesab, (rəsulullaha –salləllahu aleyhi və səlləm - verilən Kövsər adlı) hovuz, şəfaət və sirat körpüsü haqdır, (və ediləcək şəfaətlərdən bir) şəfaət, Muhəmməd –salləllahu aleyhi və səlləm - ümmətindən olan böyük günah sahibləri haqda olacaqdır. (İman edirəm) ki, Allah qullara əməllərinə görə qarşılıq verir.

---

[26]Qəbrdə sorğu sual edən iki mələyin - əleyhiməssələm - adlarıdır.

## Tövhid əhlindən kimisə böyük günaha görə təkfir etməyin və dünyada ikən Allah və rəsulunun – salləllahu aleyhi və səlləm - xəbər verdiyi kəslərdən başqası haqqında Axirətlə bağlı hökm verməyin batil olması haqqında

(İmam əş-Şafi yuxarıdakı sözünün davamı olaraq deyir).... Tövhid əhlindən heç kəsi böyük günah işləsə belə günaha görə təkfir etmirəm,[27] onları (halları ilə birgə) Allaha həvalə edirəm. Muhəmməd – salləllahu aleyhi və səlləm - ümmətindən muhsin kəsin ehsanına görə Cənnətə, pislik edənin də pisliyinə görə Cəhənnəmə girəcəyini (dünyada ikən qəti bir şəkildə) etiqad etmirəm.[28] Allah məxluqatı bildiyi və istədiyi hal üzərə yaratmışdır. Hər kəsin yolu Allahın – azzə və cəllə - onu üzərinə yaratdığı şeyə doğru asanlaşdırılmışdır. Şer olaraq belə deyirəm:

خلقت العباد على ما علمت......وفي العلم يجري الفتى والمسن
على ذا مننت وهذا خـذلت......وهذا أعـنـت وذا لـم تـــعـن
فمنهم شقي ومنهم ســـعيد......ومنــهم قبيـــح ومنــهم حـــسن

[27]Günümüzdə Allahın dinini təhrif edən bir qrup zəlalət əhli, sələfdən gələn bu sözləri istismar edərcəsinə alıb həva və həvəslərinə uyğun tətbiq edirlər. İmam küfr sahibini deyil, böyük günah sahibini zikr edir. Lakin təəssüflər olsun ki bu bidətçilər təhrif edərək kafir kəslərin küfrünü böyük günah kimi qələmə verir, bundan sonra o kafirləri təkfir edənləri xavaric, təkfirçi və başqa adlarla adlandırırlar. Buna qarşılıq olaraq bəzi bidətçilər də küfr olmayan və ya küfr olsa da dindən çıxaran böyük küfr olmayan əməllərə görə qulları təkfir edir, qanlarını, mallarını və namuslarını halal görürlər. Bu etiqadlarının ziddinə hərəkət edən müsəlmanları ircada, münafiqlikdə hətta kafirlikdə belə ittiham edirlər. Həsbunəllahu və niməl vəkil!

[28]Yəni müəyyən bir kəsin əməllərinə baxaraq onun axirətdəki məqamını təyin etmirəm. Amma ümumi olaraq etiqad etmək lazımdır ki, xeyir əməl işləyib iman üzərə ölənlər Cənnət, küfr üzərə ölənlər isə Cəhənnəm əhlidirlər. Doğrusunu Allah bilir.

**Qulları bildiyin şey (qədər) üzərə yaratmısan**
**Gənc və qoca (Sənə aid olan) elm dairəsində hərəkət edir**
**Birinə bol nemət vermisən birini isə alçaltmısan**
**Birinə yardım etmisən birinə isə yox**
**Onlar arasında bəzisi bədbəxt digəri xoşbəxtdir**
**Bəzisi çirkin bəzisi isə gözəldir**

## Öncəki müsəlmanlar arasında çıxan fitnələr barədə susmanın vacib olması haqqında

(İmam əş-Şafi) dedi: “Allahın öz peyğəmbərinə-salləllahu aleyhi və səlləm-səhabəlik etmək üçün seçdiyi saleh sələfin haqqını tanıyıram.Fəzilətlərini alır,aralarında çıxan böyük və kiçik şeylər (fitnələr və ixtilaflar) haqda susuram. O, Allahın əllərimi ondan təmizlədiyi qandır. Dilimi (o qana) batırmaq istəmirəm. Onları dost bilir, onlar üçün, eləcə də "dəvə"olayı və "siffeyn" əhli (onlardan) öldürənlər və ölənlər və Allah rəsulunun - salləllahu aleyhi və səlləm - bütün səhabələri üçün bağışlanma diləyirəm.[29]

Oturaq halda və səfərdə xuf üzərinə məsh etməyi,[30] xeyirxahla və facirlə (birgə) cihadı, qiyamət gününə qədər cüməni və iki bayram namazını, Quran və sünnətin hökmünə uyğun alış verişi, (müsəlmanlardan olan) əmr sahiblərinə namaz qıldıqları sürəcə (Allahı qəzəbləndirməyəcək şeylərdə) eşidib itaət etməyi, müsəlman başçılara səlaha[31] yönəlmələri üçün dua etməyi (haqq) görürəm.[32] Onlara qarşı qılıncla çıxılmaz. (Etiqad edirəm ki) xilafət Qureyşin haqqıdır.

---

[29]Günümüzdə çıxan bəzi bidətçi firqələr Müaviyyə bin Əbi Sufyana dil uzatmaqdan təəssüf ki, utanmır. Onlara gərəkən İmam əş-Şafi kimi əhli sünnət imamlarının, keçmiş müsəlmanlar haqqında bəslədiyi münasibəti almalarıdır.

[30]Bu iki şeydə əhli sünnəyə iki zəlalət firqəsi olan rafizilər və xaricilər müxalifət etmişlər.

[31] Doğru yola, dürüstlüyə

[32]Müsəlman başçı dedikdə, Allahın şəriətini yerli dibli dəyişib bəşəri nəcis qanunları tabe olunması vacib olan düstur halına gətirən müşrik başçılar nəzərdə tutulmur. Belələrinə qarşı çıxıb onları taxtlarından çəkib aşağı salmaq fərzdir. Lakin bu əməl məsləhəti və məfsədəti gözətərək olmalıdır. Zərəri daha çox olacaq addımlar atmaq caiz deyil.

(Yenə etiqad edirəm) ki, ”çox halda sərxoş edənin azı da şərabdır”, mutə nikahı[33] haramdır. Allahdan qorxmağı, sünnətə, rəsulullahdan – salləllahu aleyhi və səlləm - və əshabından gələn əsərlərə tabe olmağı, bidəti və həva-həvəsi tərk edib ondan uzaq durmağı tövsiyə edirəm.

[33]Siğə

## Rəşidi xəlifələr, Əbu Bəkr, Ömər, Osman və Əli – Allah hamısından razı olsun - haqqında

(Fəzilət baxımından öncə) Əbu Bəkri, sonra Öməri, sonra Osmanı, sonra Əlini önə verirəm. Allah hamısından razı olsun! Onlar raşidi xəlifələrdir.(İman edirəm) ki,rəsulullahdan –salləllahu aleyhi və səlləm - sonra (onun ümmətindəki) insanların ən xeyirlisi Əbu Bəkr, Ömər, Osman və Əlidir. Başqa bir rəvayətdə: Sonra Ömər sonra Osman, sonra Əlidir.[34]

Əbu Bəkrin xilafəti haqdır. Allah səmadan ona (xilafətinə) hökm vermiş, kitabında üzərinə ittifaq olunmuş bir dəlillə peyğəmbərinin – salləllahu aleyhi və səlləm - əshabının qəlblərini onun üzərə cəm etmişdir. Allah Təala demişdir:

قُلْ لِلْمُخَلَّفِينَ مِنَ الْأَعْرَابِ سَتُدْعَوْنَ إِلَىٰ قَوْمٍ أُولِي بَأْسٍ شَدِيدٍ

**“Cihaddan geri qalan bədəvilərə de ki, güclü bir qövmlə savaşa çağrılacaqsınız”**
(əl-Fəth, 16)

O qövmün “Bəni-Hənifə” olduğunu desək, onlarla savaşı o (Əbu Bəkr) üstələndi və savaşa çağırdı. (O güclü qövm) farslar olduğunu deyərsək onlarla savaşı Ömər üstələndi. O da Əbu Bəkrin xəlifə təyin etdiyi birisi idi.”

---

[34]Bu məsələdə Allah rəsulunun – salləllahu aleyhi və səlləm - yoluna müxalifət edənlər rəfizilər və xaricilərdir. Allah bu dörd xəlifələrdən hər hansı birinə düşmən olan, onlar haqqında naqis davranan hər kəsi məhv etsin, amin.

(Yenə) dedi: “İnsanlar Əbu Bəkrin xilafətinə icma etmişdir. Əbu Bəkr də Öməri xəlifə təyin etmişdir. Sonra Ömər altı nəfərdən ibarət şura təyin etdi ki, aralarından birini seçsinlər, beləliklə Osmanı seçdilər”.

(Yenə) demişdir: “...Çünki insanlar rəsulullahdan –salləllahu aleyhi və səlləm - sonra (başçı seçməyə) məcbur oldular. Səma altında Əbu Bəkrdən daha xeyirlisini tapmadılar və öhtəliklərini ona verdilər”.

Şer olaraq demişdir:

وإن أبا بكر خلـــيفة أحــــمد......وكان أبو حفص على الحق يحرص
وأشهد ربـــي أن عثمان فاضل......وأن علـيــا فـضلــه مـتخصص
أئمة حــــق يـــهتدى بهــداهم......لحـــى الله مــن إياهم يـــتنقص
فمــــا لعتاة يشهدون ســفاهة......ومـــــا لسفيه لا يحيص فيخرص

**Həqiqətən Əbu Bəkr Əhmədin[35] xəlifəsi**
**Əbu Hafs[36] isə haqqa həris birisidir**
**Osmanın fəzilətli olmasına rəbbimi şahid tuturam**
**Eləcə də Əlinin xüsusi fəzilət sahibi olduğuna**
**Onlar haqq imamlarıdır, onların yoluyla hidayət olunar**
**Onlar haqqında naqis davrananlara Allah lənət etsin**
**Dikbaşlara nə gəlib ki səfehliyə şahid olurlar**
**Səfehə nə gəlib ki qaçıb qurtulmaq yerinə yalan danışır?!**

Başqa rəvayətdə: **Azğına nə gəlib ki qorxmaq yerinə yalan danışır?!**

Yenə şer olaraq belə demişdir:

إذا نـــحن فضلنا علــيا فــإننا......روافــض بالتفضيل عند ذوي الــجهل

---

[35]Muhəmməd peyğəmbərin. Allahın salamı, xeyir duası, rəhməti və bərəkəti onun, ailəsinin, xüsusən zövcələrinin, səhabələrinin və qiyamətə qədər onların yolunu davam etdirənlərin üzərinə olsun, amin.
[36]Yəni Ömər bin əl-Xattab. Əbu Hafs, Ömər bin əl-Xattabın –radiyallahu anhu va ardahu-künyəsidir.

وفضل أبـــي بكر إذا مـــا ذكرته......رميـــــت بنصب عند ذكري للــفضل
فلا زلت ذا رفض ونصب كلاهما......أدين بحبـــهما حتـــى أوسد بالـرمل

**Biz Əlini fəzilətli bildiyimiz zaman**
**Cahillər yanında bu əməlimizlə rafizilər kimi tanınarıq**
**Əbu Bəkrin fəzilətini zikr etsəm**
**Onun fəzilətini zikr etməmlə nasibilikdə ittiham olunuram**
**İndiyə kimi həm rafizilik həm nasibilik daşıyıram**
**İkisi də onları sevdiyim üçündür, sürünsəm də onları sevəcəm.**

(Yenə belə) demişdir: “Əli, Əbu Bəkr, Ömər və başqaları haqda (pis) danışanları Allah ona görə yaradıb ki, (bu səhabələr) öldükdən sonra da onlara əcr gəlsin”

(Həmçinin) demişdir: “Fitnə haqqında Osman bin Affanın hədisindən başqa heç bir hədis səhih deyil. O (Osman), peyğəmbərin – salləllahu aleyhi və səlləm - yanından keçərkən Allah rəsulu – salləllahu aleyhi və səlləm - dedi: “O gün bu və əshabı haqq üzərə olacaqlar”

## Bidәt fiqәlәri haqqında

Qәdәrilәrin arxasında namazı mәkruh görәrdi. Rafizilәr zikr olunduqda onları çox şiddәtli şәkildә eyiblәyәrdi. Belә deyәrdi: "Rafizilәr әn şәrli camaatdır". Hәmçinin deyәrdi: "Rafizilәr kimi yalana daha çox şahidlik edәn birisini görmәdim".

## İman haqqında

(İmam əş-Şafi) dedi: “Allah Təalanın

لِيَزْدَادُوا إِيمَانًا

**“İmanları artsın deyə”**
(əl-Fəth, 4)

sözünə görə şahidəm ki iman qövl, əməl və qəlbin bilməsidir.[37] İtaətlərlə artar günahlarla azalar”.

(İmam əş-Şafi) dedi: “İrca əhlinə[38] bu ayətdən daha çox höccət olacaq bir şey yoxdur**:**

وَمَا أُمِرُوا إِلَّا لِيَعْبُدُوا اللَّهَ مُخْلِصِينَ لَهُ الدِّينَ حُنَفَاءَ وَيُقِيمُوا الصَّلَاةَ وَيُؤْتُوا الزَّكَاةَ وَذَٰلِكَ دِينُ الْقَيِّمَةِ

**“Hənif şəkildə dini Allaha xas qılaraq, namaz qılıb zəkat verərək Allaha ibadət etmələrindən başqa bir şeylə əmr olunmadılar. Doğru dürüst və qiymətli din də budur.”**
(əl-Bəyyinə, 5)

Dilimlə dediyimi qəlbən də etiqad edirəm, imanımda şəkk etmirəm, şer olaraq deyirəm:

**شهدت بأن الله لا رب غيره......وأشهد أن البعث حــق وأخلص**

**وأن عـرى الإيمان قول مبين......وفعل زكــي قـــد يزيد وينقص**

[37]Qəlbin etiqadı.
[38]Murciələrə.

**Şahidəm ki Allahdan başqa rəbb yoxdur**
**Dirilmənin də haqq olduğuna ixlasla şəhadət edirəm**
**Yenə şahidəm ki İmanın əsası açıq aydın söz**
**Və (riyadan) təmizlənmiş əməldir,[39] artar və azalar**

Qalan beytlər öncədən zikr olunmuşdur.[40]

---

[39]Söz, həm dilin həm də qəlbin sözü olan etiqadı əhatə edir. Eləcə də əməl, həm əzalarla zahiri əməlləri, həm də qəlbin əməlləri olan, qorxu, sevgi və s. kimi batini əməlləri əhatə edir.
[40]Öncədən xəlifələr haqda zikr olunan beytlər bu beytlərin davamıdır.

## Vəsiyyət

(İmam əş-Şafi) dedi: "Bu zikr etdiklərimizin hamısına iman haqdır (vacibdir). Kim bunlardan bir şey tərk edərsə o, Allahın kitabına və rəsulunun –salləllahu aleyhi və səlləm - sünnətinə müxalifdir. Allahdan haqqı ilə qorxun və yalnız müsəlman olaraq ölün. Bu, Allahın əvvəlkilərə və sonrakılara etdiyi vəsiyyətdir. Kim Allahdan qorxarsa (Allah) ona çıxış yolu göstərər, və gözləmədiyi yerdən onu ruziləndirər. Bacardığınız qədər Allahdan qorxun. Bunun[41] üzərə yaşayır, inşəAllah bunun üzərə ölər və bunun üzərə dirildilərəm."

**Allahın yardımı ilə bitdi və tamamlandı.**



[41]Bu zikr etdiyim əqidənin